*© "Metafizika" Journal* | ***p-ISSN 2616-6879***
***Vol 6, issue 1, serial 21, 2023. pp.10-32*** | ***e-ISSN 2617-751X***

**UOT:** 1 (091).
**KBT:** 60.55
**MJ №** 151

# Heydər Əliyevin azərbaycançılıq fəlsəfəsi

**Əlәddin Məlikov***

**Abstrakt.** Fəlsəfənin təzahür meydanı təfəkkürdür. Təfəkkür isə müxtəlif formalarda təcəssüm və təzahür edir. Tarixdə fəlsəfəyə fərqli yanaşmalar olmuşdur. Fəlsəfənin bir elm olaraq öyrənilməsi və öyrədilməsi əsas istiqamət olsa da, bir əsas şərti var, o da onun öyrənilməsinin həqiqətin üzə çıxmasına yardımçı olmasıdır. Tarix boyu bu proses fəlsəfənin ilahiyyatdakı təzahüründə, daha sonralar isə poeziyadakı təcəssümündə əks olunmuşdur.

Heydər Əliyevin "azərbaycançılıq fəlsəfəsi" cəmiyyətin formalaşmasına və inkişafına istiqamətlənmişdir. Başqa sözlə desək, fəlsəfəni dövlətçiliyin və insan həyatının praktiki işlərinə xidmət etməyə yönəltmişdir. Məhz bu səbəblə, Heydər Əliyevə görə "azərbaycançılıq fəlsəfəsi" həm qayə, həm də vasitədir. Bu fəlsəfənin tam formalaşması Azərbaycanın müstəqil Respublika dövrünə təsadüf etsə də, təməlləri uzun illər öncədən atılmışdır. Burada əsas məsələ özünüdərk, özünəqayıdış və özünüifadədir.

"Azərbaycançılıq fəlsəfəsi"nin ümumi mahiyyəti xalqın mənsubiyyətindən və fikir fərqliliyindən asılı olmayaraq, bir ənənəni və mədəni irsi qorumaqdan və yaşatmaqdan ibarətdir. Bu isə özü-özlüyündə cəmiyyətin fikir təhlükəsizliyinin təmin olunmasıdır. Əslində isə baş verə biləcək problemlər və inkişafın qarşısındakı maneələrin aşılması xarakterini daşıyır. Heydər Əliyev bu qloballaşma, çoxmədəniyyətlilik və kosmopolitik kimi anlayışları bir vahid sistem kimi görsə də, onların hamısını birləşdirən vahid bir fəlsəfəni ərsəyə gətirdi və bu "azərbaycançılıq fəlsəfəsi" idi. O, bir çox məruzə və çıxışlarında çoxmədəniyyətliliyin vahid ünsürünə işarə etmiş, respublikada olan plüralizm və kəsrətin birlik və vəhdətə çevrilməsini vurğulamış, bunun mümkünlüyünü yalnız "azərbaycançılıq fəlsəfəsi"nin həyata keçməsi ilə gerçəkləşə biləcəyini ifadə etmişdir.

* Fəlsəfə üzrə fəlsəfə doktoru, dosent,
AMEA Fəlsəfə və Sosiologiya İnstitutunun aparıcı elmi işçisi; Bakı, Azərbaycan
E-mail: aladdin.malikov@gmail.com
https://orcid.org/0000-0001-5830-6764
**Məqaləyə istinad:** Məlikov, Ə. [2023] Heydər Əliyevin azərbaycançılıq fəlsəfəsi. *"Metafizika" jurnalı. 6(1),* səh. 10-32.

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 12.12.2022*
*Təkrar işlənməyə göndərilmişdir: 24.01.2023*
*Çapa qəbul edilmişdir: 14.03.2023*

“Azərbaycançılıq fəlsəfəsi”nin strateji planı və əsas elementləri Azərbaycan dili, din və mədəniyyətin inkişafı, milli-mənəvi dəyərlərin və adət-ənənələrin qorunub saxlanmasından ibarətdir. Məqalədə bütün bunlar əlahiddə şəkildə bariz nümunələrlə izah edilmişdir. Ümumilikdə Heydər Əliyevin “azərbaycançılıq fəlsəfəsi” Azərbaycan xalqını birləşdirməyə, müstəqilliyin qorunmasına, respublikaçılıq ənənələrinin inkişafına, hüquqi və sosial dövlətin qurulmasına xidmət edir.

**Açar sözlər:** Heydər Əliyev, Azərbaycan Respublikası, azərbaycançılıq fəlsəfəsi, Azərbaycan dili, Azərbaycan mədəniyyəti, milli-mənəvi dəyərlər, milli şüur, ideoloji təhlükəsizlik

## 1.Giriş

Azərbaycan xalqının böyük oğlu Heydər Əlirza oğlu Əliyev (1923-2003) dövrünün görkəmli rəhbər idarəçisi idi. Ulu öndər həm də. Vilyam Şekspir rəhbərləri başçılardan ayırır. Ona görə rəhbərlər böyük yaradılmış insanlardır və onlar tarixi dəyişdirmək gücünə malikdirlər. Tarixdə onların qərarları inkişaf doğuran məsələlərlə nəticələnir. *“Rəhbər və başçı”* məqaləsində geniş və təfsilatlı bunların fərqi göstərilmişdir. *“Böhranlar, perspektivlər və mühüm hadisələr, qurucu, seçilən və yüksək siyasətçiləri ümumi adət-ənənə ilə yaşayan kütlədən ayırır. Onların qərarını, davranışını, rəftarını və sözlərini ictimaiyyətə çatdırır. Heç bir mühüm işi həyata keçirmək və inkişaf etdirmək keyfiyyətli və alicənab insanlar olmadan mümkün deyil. Alicənab insanlar iradə sərgiləyib, iş görürlər. Orta insanlar isə öz arzularına çatmaqda giriftardılar. Tarixin ən böyük siyasətçilərinin ən böyük arzuları öz ölkələrinin güc və imkanlarını artırmaq olmuşdur. Bir ölkənin gücünün, qüdrətinin və mövqeinin yüksəlməsi bir liderin edə biləcəyi ən böyük işdir. Çünki bu, həm politologiyadan, həm də siyasi zəkadan qaynaqlanır. Onun eniş-yoxuşu və miqyasının həcmi cərrahlıq, mühəndislik və hətta ixtira və yeni kəşflərlə belə müqayisə edilə bilməz”* (Məlikov, Ə., Əmirov, E, 2020, səh.26).

Heydər Əliyev Azərbaycan tarixində məhz belə rəhbər və alicənab şəxsiyyətlərdəndir. Onun formalaşdırdığı və inkişaf etdirdiyi *“azərbaycançılıq fəlsəfəsi”* Azərbaycana və onun elminin əsas akademik göstəricisi olan fəlsəfəyə yeni istiqamət vermişdir. Beləki, bu fəlsəfi məfkurə ilə Heydər Əliyev Azərbaycanın qloballaşan dünyada xüsusi yerini müəyyən etmiş, milli dövlətçiliyin təməlini ataraq dünya azərbaycanlılarının həmrəyliyi üçün sabit zəmin yaratmışdır. Nəticədə Azərbaycan ziyalısını, mütəfəkkirini və maarifçilərini son yüzilliklərdə ciddi şəkildə düşündürən inkişaf və dirçəliş problemləri bütövlükdə Heydər Əliyevin fəaliyyəti və

*“azərbaycançılıq fəlsəfəsi”* ilə strateji dövlət siyasətindən fəlsəfi-praktiki siyasət müstəvisinə keçmişdir.

Heydər Əliyevin parlaq siyasi zəka və istedadı sayəsində Azərbaycan Respublikasının hazırki gerçəklikləri yaradılmış və gələcəyə aparan yollar müəyyən edilmişdir. Məhz buna görə də Azərbaycan tarixinin 1969-cu ildən bəri yaşanan dövrü Heydər Əliyevin adı ilə sıx bağlıdır və tariximizə *“Heydər Əliyev dövrü”* kimi həkk olunmuşdur. Bu dövrün Azərbaycanın gələcək fəlsəfi taleyi baxımından başlıca məzmunu *“azərbaycançılıq fəlsəfəsi”* dünyagörüşüdür.

**2.Özünüdərk, özünəqayıdış və özünüifadə**

Burada əsas olaraq Heydər Əliyevin *“azərbaycançılıq fəlsəfəsi”* mövzusu araşdırılır. Lakin onun həyat və yaradıcılığına toxunmaq özət olaraq bəzi zəruri məqamları vurğulamaq onun bu fəlsəfəsinin formalaşmasına və inkişafına dair çalışmalarını təqdim etməkdə yardımçı olacaqdır. Bu səbəbdən onun həyat və yaradıcılığını qısa və xroniki olaraq əks etdirmək zərurəti yaranır. Heydər Əliyevin atası Əlirza Əliyev, anası İzzət xanım Əliyevadır. Həyat yoldaşı Zərifə Əliyeva, övladları İlham Əliyev və Sevil Əliyevadır.

Heydər Əliyevin həyat və yaradıcılığını beş əsas mərhələyə bölmək olar:

1. 1923-1969- uşaqlıq, gənclik və təhsil illərindən başlayaraq SSRİ Nazirlər Soveti yanında DTK tərəfindən general-mayor rütbəsi alanadək olan dövr;
2. 1969-1982- Azərbaycan KP MK-nin birinci katibi olduğu dövr;
3. 1982-1987- Sovet. İKP MK siyasi bürosunun üzvü olduğu dövr;
4. 1987-1993- Sovet. İKP MK siyasi bürosunun üzvlüyündən, SSRİ Nazirlər Soveti sədrinin birinci müavini vəzifəsindən istefa verməsindən - Naxçıvan Muxtar Respublikası Ali Məclisinin sədri olan dövr;
5. 1993-2003- Azərbaycan Respublikasının Prezidenti olduğu dövr.

Lakin burada əsasən iki, üç və beşinci bəndlərdə qeyd edilən dövrlərə aid nümunələr göstərəcək və sitatlar verəcəyik. Bu səbəbdən mövzu üzərindən daha çox araşdırdığımız məsələyə diqqətimizi yönəldəcəyik.

Azərbaycanın müstəqil dövlət quruculuğuna aparan yol və bugünkü müstəqil Azərbaycanın formalaşması üçün çalışmalar SSRİ-dövründən, daha dəqiq- 1969-cü ildən, məhz Onun hakimiyyətə gəlişindən sonra başlamışdır. Bu mənada, azərbaycançılığın ən parlaq səhifələri də məhz həmin illərdən etibarən yazılmışdır. Heydər Əliyev o dövrdə mövcud olan ideologiyanın qəlibləri çərçivəsində Azərbaycanda milli ruhun tamamilə sıxışdırılmasına yol verməmiş, əksinə, onu yüksəlişi naminə bütün fürsətlərdən maksimum

dərəcədə istifadə etmişdir. Bu cəhətdən, Heydər Əliyevin respublika rəhbərliyinə gəlişindən sonrakı dövr, milli özünüdərkin, milli özünəqayıdışın və milli özünüifadənin başlanğıcı kimi qəbul edilir. *“Heydər Əliyevin siyasi irsi və azərbaycançılıq”* toplusunun bir məqaləsində vurğulandığı kimi, *“Azərbaycançılıq millətindən asılı olmayaraq özünü azərbaycanlı sayan vətəndaşların həmrəyliyi üçün möhkəm istinad mənbəyi, ideoloji bünövrədir”* (Mədətli, E. 2020. səh. 17). Bütün bunların tarixi məhz bu dövrdən etibarən başlamışdır. Heydər Əliyev *“azərbaycançılıq fəlsəfəsi”*nin əsas ideyasını və siyasi istiqamətini də məhz xalqın milli şüurunun bütün forma və vasitələri ilə birgə, milli qürur hissinin güclənməsində və milli dərkin yüksəlişinə təkan verən sürətli inkişaf strategiyasının gerçəkləşdirilməsində görmüş və onları formalaşdırmağa çalışmışdır.

**3.*“Azərbaycançılıq fəlsəfəsi”* ideoloji təhlükəsizliyin əsas prinsipi kimi**

Heydər Əliyev 1969-1982-ci illərdə milli kadrların hazırlanması, ana dilinin inkişafı, mədəniyyətin formalaşması, milli şüura və düşüncəyə malik olan milli mentalitet daşıyıcıları sayılan kadrların yetişməsinə səy göstərmişdir. Ulu öndər əmin idi ki, millətin müstəqilliyinin təməlini onun iqtisadi cəhətdən azadlığı şərtləndirir. O illərdə milli fəlsəfənin qıtlığı ucbatından baş alıb gedən mənəvi, mədəni və məişət tənəzzülü kimi mənfi hallar Heydər Əliyevin hakimiyyətə gəlişi ilə tədricən aradan qaldırıldı. Onun fəaliyyətinin nəticəsidir ki, həmin illər baş verən dəyişikliklərin miqyasına görə mədəni və ictimai sahələrdəki dərin islahatların səciyyəsi və xalqın maddi rifahının keyfiyyətcə yeni mərhələyə keçməsi Azərbaycanın quruculuq tarixində, sözün əsl mənasında, ən parlaq səhifələri təşkil etmişdir.

Milli təhlükəsizliyin çoxsaylı komponentləri vardır: siyasi təhlükəsizlik, iqtisadi təhlükəsizlik, enerji təhlükəsizliyi, qida təhlükəsizliyi və… Bunların hər biri ayrılıqda, eləcə də bütövlükdə respublikanın mövcudluğu və həyatı üçün vacib elementlərdir. Bu sistemə fəlsəfi və ideoloji təhlükəsizlik komponentini də daxil etmək zəruridir. Respublika öz enerji, qida və milli təhlükəsizliyini qoruduğu kimi fəlsəfi təhlükəsizliyini də qorumalı və təmin etməlidir. Fəlsəfi təhlükəsizliyin ümumi mahiyyəti mənsubiyyətindən və fikir fərqliliyindən asılı olmayaraq xalqın əsas bir ənənəni və mədəni irsi qoruması və yaşatmasından ibarətdir. Cəmiyyətin ideoloji təhlükəsizliyinin təmin olunması, əslində, baş verə biləcək problemlərin və inkişafa əngəl olan maneələrin qarşısının alınması xarakteri daşıyır. Əks təqdirdə bunlar qarşıdurmalara və daxili çəkişmə və münaqişələrə səbəb ola bilər.

Fəlsəfi və ideoloji təhlükəsizlik bir sıra prinsiplərdən ibarətdir. Bu prinsiplər respublikanı təsdiqlənmiş, ədalətli, keyfiyyətcə daim yenilənən bir mahiyyətə malik orqanizm kimi həm formalaşdırır, həm də şərtləndirir.

Heydər Əliyev məhz qloballaşma, çoxmədəniyyətlilik və kosmopolitlik kimi anlayışları vahid sistemin istiqamətləri kimi görsə də, onların hamısını birləşdirən tək bir fəlsəfəni ərsəyə gətirdi və bu *"azərbaycançılıq fəlsəfəsi"* idi. O, bir çox məruzə və çıxışlarında çoxmədəniyyətliliyin vahid ünsürünə işarə etmiş, başqa sözlə ifadə etsək, respublikada olan plüralizm ilə kəsrətin, monizm və vəhdətə çevrilməsinin zəruriliyini vurğulamış və bunun yalnız *"azərbaycançılıq fəlsəfəsi"* ilə əldə oluna biləcəyini ifadə etmişdir. *"Azərbaycançılıq fəlsəfəsi"*nin əsas təhlükəsizlik prinsipləri aşağıdakılardır:

**3.1.**Cəmiyyətdəki milli azlıq nümayəndələrinə bərabər siyasi münasibət.

Prezident İlham Əliyev öz çıxışlarının birində vurğulamışdı ki, xarici ölkələrdə ondan tez-tez təəccüblə soruşurlar: "Azərbaycanda müxtəlif konfessiya rəhbərlərinin və üzvlərinin bir-birinə belə tolerant, dostca yanaşmasının əsasında nə durur? Bunun səbəbi nədir?" Bu sual bir azərbaycanlı üçün qəribə səslənir. Çünki çağdaş azərbaycanlı bu münasibətlərin mahiyyətini ruhu ilə, mənəviyyatı ilə hiss edir. O, bunun səbəbini bilməyə bilər. Udduğumuz hava və içdiyimiz su kimi, bu münasibət də bizim həyatımız üçün son dərəcə vacibdir. Amma bu sualın, əlbəttə ki, ciddi cavabı da yox deyildir.

Azərbaycanda belə bir mühitin olması onunla bağlıdır ki, ölkə başçısı və bütövlükdə dövlət müxtəlif konfessiyalara eyni siyasi münasibət bəsləyir. Birini digərindən fərqləndirmir. Bərabər siyasi münasibət də öz növbəsində konfessiyaların bir-birinə və hər birinin ayrılıqda dövlətə tolerant münasibətini şərtləndirir. Nəticə etibarıilə *"azərbaycançılıq fəlsəfəsi"*nin əsas və zəruri prinsiplərindən biri məhz ölkə daxilindəki müxtəlif konfessiyalara siyasi münasibətin bərabər şəkildə yönəlməsi mexanizmini formalaşdırmaqdan doğur. Bu prinsipin təməlini Heydər Əliyev formalaşdırmış və dövlət siyasəti kimi inkişaf etdirmişdir.

**3.2.***"Azərbaycançılıq fəlsəfəsi"*nin digər bir təhlükəsizlik prinsipi də ölkədə mövcud olan etnik müxtəlifliyin vəhdətinin qorunmasına yönəlmiş dövlət qayğısının formalaşdırılması ilə müəyyən edilir.

Azərbaycan müxtəlif xalqların dinc, dostluq və sülh şəraitində yaşadığı, sevinci və kədəri birgə bölüşdüyü məkandır. Bu məkanı qədim xalqların bugünkü varisləri olan udilər, ingiloylar, buduqlar, xınalıqlılar, qrızlar, yəhudilər, talışlar, tatlar, tatarlar, ruslar, avarlar, ləzgilər, gürcülər, kürdlər, yaxın keçmişdə almanlar, digər xalqlar və etnik qruplar öz ortaq vəhdətinə çevirə biliblər. Bir kənd qədər sakini olan, dili və etnik kimliyi bu kənddən başqa heç bir yerdə təmsil olunmayan xınalıqlılar və ceklilər də Azərbaycana məxsusdur. Bütün bu xalqların dil, din və mədəni zənginliklərini Azərbaycan dövləti öz zənginliyi, öz gücü sayır. Heydər Əliyev deyirdi:

*“Dövlət, ölkə nə qədər çox xalqı birləşdirsə, bir o qədər zəngin olur, çünki onların hər biri ümumdünya mədəniyyətinə və sivilizasiyasına öz töhfəsini verir”* (Əliyev, H. 1997).

Azərbaycanda yaşayan xalq və etnik qrupların nümayəndələrini bu gün müstəqil Azərbaycanın hər bir sahəsində- siyasətdə, iqtisadi sferada, təhsildə, mədəni-mənəvi müstəvidə, bir sözlə, bütün istiqamətlərdə görmək mümkündür. Ölkədə məskunlaşmış bütün xalqların və etnik qrupların nümayəndələrinə dövlət tərəfindən bərabər münasibətin göstərilməsi bu prinsipin əsasını təşkil edir. Bu gün Azərbaycanda formalaşan bu prosesin təməlində Heydər Əliyevin *“Azərbaycançılıq fəlsəfəsi”* dayanır. Bu səbəbdən bir kəsin milli kimliyi onun bu gün özünü azərbaycanlı hiss etməyinə mane olmur. Hər bir kəs öz ana dilində danışa, yaza bilər və özünün vacib olan digər mədəni ehtiyaclarını ödəyə bilər. Konstitusiyanın “Milli mənsubiyyət hüququ” adlı 44-cü maddəsində göstərilir:

*“Hər kəsin milli mənsubiyyətini qoruyub saxlamaq hüququ vardır. Heç kəs milli mənsubiyyətini dəyişdirməyə məcbur edilə bilməz”* (tərc: Məlikov, Ə. 2019. səh. 26).

**3.3.** *“Azərbaycançılıq fəlsəfəsi”*nin başqa bir prinsipi də respublikada mövcud olan fərqli dil, din və mədəniyyətlərin qorunmasına və inkişafına dövlət və cəmiyyət tərəfindən dəstək verilməsinin təmin edilməsidir.

Azərbaycanda dini-mədəni vəhdətin formalaşması və öyrənilməsi üçün tam şərait vardır. Bunun nəticəsində dini-mədəni azlıqlar Respublika daxilində özlərini yad kimi hiss etmirlər. Ümumazərbaycan dini-mədəni konteksti onların hər biri üçün mənəvi məkana çevrilmişdir. Bu, əsas istiqamət olaraq, bu gün *“azərbaycançılıq fəlsəfəsi”*nin məhsuludur desək, yanılmarıq. Təhsil sahəsi ilə bağlı konkret olaraq onu qeyd etmək olar ki, müstəqilliyin ilk dövründən başlayaraq ölkədə Azərbaycan dili ilə yanaşı rus, gürcü və ləzgi dillərində fəaliyyət göstərən orta məktəblər olmuşdur. Qeyd etmək yerinə düşər ki, 2003-cü ildə Bakıda ivrit, yəhudi tarixini və mədəniyyətini tədris edən özəl yəhudi orta məktəbi açılmışdır. Əksər ali məktəblərdə rusdilli bölmələr fəaliyyət göstərir. Dövlət vəsaiti hesabına müxtəlif dillərdə əlifbalar, tədris proqramları və digər dərsliklər, məktəbli lüğətləri mütəmadi olaraq çap edilir. Bu prosesin Azərbaycan nümunəsindəki analizi göstərir ki, onun prinsiplərinə məqsədyönlü şəkildə riayət etdikdə ölkənin həm daxili potensialı öz zənginliklərini ən dərin qatlardan daha məhsuldar üzə çıxarır, həm də ölkə öz beynəlxalq imicinə müsbət çalarlar qatır.

Bir çox cəmiyyətlərdə xalqların hələ də ayrıla bilmədiyi “öz” və “yad” qarşıdurması var. Lakin “öz” və “özgə” yanaşması respublikada Heydər

Əliyevin yürütdüyü *"azərbaycançılıq fəlsəfəsi"* nəticəsində həmvətənlərimiz üçün əhəmiyyətini itirmişdir.

**4.*"Azərbaycançılıq fəlsəfəsi"* əsas strateji istiqamət kimi**

Heydər Əliyevin 1969-1982-ci illərdə Azərbaycana rəhbərlik etdiyi dövrdə gördüyü işlər milli özünüdərk duyğularını ideoloji sistemin keçmiş buxovlarından xilas edərək, xalqın tarixi yaddaşının özünə qaytarılması kimi təməl prinsiplər əsasında milli ruhun yüksəlişini təmin etmiş, xalqımızın qəlbində illərdən bəri sıxılıb qalmış milli dövlətçilik ideyasının gələcəkdə böyük hərəkətverici qüvvəyə çevrilməsi üçün münbit zəmin yaratmışdı.

SSRİ-nin əyalətlərindən biri kimi baxıldığından 1960-cı illərdən başlayaraq respublikada kosmopolit bir əhvali-ruhiyyə hökm sürdüyünə görə milli kadrların hazırlanması, ana dilinin inkişaf etdirilməsi və istifadə olunması, dövlət idarəetmə strukturlarında çalışan məmurların azərbaycanlı olmasına diqqət yetirilməsi istiqamətində nəinki ciddi addım atılmamış, hətta bu yöndə edilən bəzi təşəbbüslərin qarşısı alınmışdı ki, belə bir halda, heç şübhəsiz, milli şüura malik olan, milli düşüncə ilə yaşayan və milli dəyərlərin daşıyıcısı sayılan kadrların yetişməsinə çox ciddi maneələr törədilirdi.

Heydər Əliyev əmin idi ki, millətin siyasi müstəqilliyinin təməlini onun milli kadr potensialı və iqtisadi cəhətdən azadlığı şərtləndirir. Məhz bu düşüncənin nəticəsidir ki, 1970-1982-ci illər baş verən dəyişikliklərin miqyasına görə, iqtisadi və sosial sahədəki dərin istehsalatın səciyyəsi və xalqın maddi rifahının keyfiyyətcə yeni mərhələyə keçməsi Azərbaycanın inkişaf salnaməsində ən parlaq səhifələri təşkil etmişdir. E.Mədətli doğru qeyd edir ki, *"Böyük strateq azərbaycançılığın tarixən formalaşmış ayrı-ayrı komponentlərini vahid sistem və konsepsiya halına gətirərək onu dövlət idarəçiliyinin elmi-nəzəri əsasına çevirdi. Məhz Heydər Əliyev dühasının səyi ilə azərbaycançılıq mahiyyətcə real məzmun daşıyaraq praktikada realizə imkanları qazandı"* (Mədətli, E. 2020. səh. 16). Ümumiyyətlə qeyd etmək yerinə düşər ki, SSRİ-nin ən yüksək dövlət mükafatları, ordenləri və adları ulu öndərin hakimiyyəti dövründə azərbaycanlı elm, ədəbiyyat, incəsənət və mədəniyyət xadimlərinə verilmişdir.

**5.Heydər Əliyev fenomeni və *"azərbaycançılıq fəlsəfəsi"*nin elementləri**

Fəlsəfəyə tarixən müxtəlif baxışlar olmuşdur. Fəlsəfənin bir elm olaraq öyrənilməsi və öyrədilməsi əsas istiqamət olsa da, bundan daha mühüm sual fəlsəfənin öyrənilməsinin nəyə xidmət etməsidir. Filosofların yekdilliklə verdiyi cavab budur ki, fəlsəfənin öyrənilməsi həqiqətin üzə çıxmasına yardımçı olmalıdır. Bəli, bəs həqiqət haradadır? Bunun cavabında müxtəlif fikirlər mövcuddur. Bəziləri fəlsəfənin nəticə və perspektivini poeziyada görür və qeyd edirlər ki poeziya fəlsəfənin çiçək açmasıdır. Digərləri

fəlsəfəni ilahiyyatın inkişafındakı rolunda görür. Başqa bir qrup da var ki, fəlsəfənin xidmətini dövlətçilik və insan həyatının praktiki işlərində görür. Heydər Əliyev bu baxış bucaqlarına əsaslanaraq *“azərbaycançılıq fəlsəfəsi”*ni ortaya qoydu. Heydər Əliyevin *“azərbaycançılıq fəlsəfəsi”* Azərbaycan xalqını birləşdirməyə, müstəqilliyin qorunmasına, respublikaçılıq ənənəsinin inkişafına, hüquqi və sosial dövlətin qurulmasına xidmət etməkdən ibarət idi. Heydər Əliyev 9 noyabr 2001-ci ildə Dünya azərbaycanlılarının I qurultayında *“azərbaycançılıq fəlsəfəsi”*nin prioritet istiqamətlərini belə nəzərə çatdırmışdır:

> *“Müstəqil Azərbaycan dövlətinin əsas ideyası [fəlsəfəsi] azərbaycançılıqdır. Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir və biz azərbaycançılığı- Azərbaycanın dilini, mədəniyyətini, milli-mənəvi dəyərlərini, adət-ənənələrini yaşatmalıyıq”* (Heydər Əliyevin Dünya azərbaycanlılarının I qurultayındakı çıxışından).

*“Azərbaycançılıq fəlsəfəsi”* milli birlik və həmrəyliyin möhkəmləndirilməsi, dünya azərbaycanlıların diaspor şəklində təşkilatlanması və öz maraqlarını, hüquqlarını, azərbaycançılıq ideallarını beynəlxalq miqyasda müdafiə etmələri üçün strateji proqramdır.

Bu fəlsəfəni ərsəyə gətirən, inkişaf etdirən və bir fəlsəfi hərəkat kimi formalaşdıran məhz Heydər Əliyevdir. Amma bunun gerçəkləşməsi üçün Heydər Əliyevin gördüyü işləri və fəaliyyətini işıqlandırmağı, faktları ortaya qoymağı zəruri hesab edirik.

*“Azərbaycançılıq fəlsəfəsi”* sahəsində Heydər Əliyevin uzaqgörən strateji fəaliyyətləri həddən ziyadə çoxdur. Burada isə Onun gördüyü bəzi işləri qısa olaraq sadalayaq:

**5.1.*“Azərbaycançılıq fəlsəfəsi”*nin strateji planı olan Azərbaycan dili**

Aydındır ki, fəlsəfənin təzahür meydanı təfəkkürdür. Təfəkkürün təcəssümü dildədir. Dil insan cəmiyyəti üçün kainatın ulu memarının verdiyi və başqa heç nə ilə əvəz oluna bilməyən müqəddəs nemət, universal ünsiyyət vasitəsidir. Görkəmli ədib və tənqidçi F.Köçərli hələ keçən əsrin əvvəllərində yazırdı:

> *“Ana dili millətin mənəvi diriliyidir, həyatının mayəsi mənziləsindədir. Ananın südü bədənin mayəsi olduğu kimi, Ana dili də ruhun qidasıdır ... Bir millətin malını, dövlətini, hətta vətənini əlindən alsan ölüb-itməz, amma dilini alsan fovt (puç) olar və ondan bir nişan qalmaz”* (Köçərli, F. 1913, №22).

Hakimiyyətə gəldiyi ilk gündən etibarən Heydər Əliyevin gələcəyə hesablanan milli dövlət qurulucuğunun əsasını təşkil edən strateji proqramında Azərbaycan dili ayrıca diqqət mərkəzində idi. 1978-ci il

Konstitusiyasında Azərbaycan dilinin dövlət dili statusu kimi təsbit olunması Heydər Əliyevin respublika rəhbərliyi dövründə Azərbaycan dilinə rəsmi dövlət dili statusu qazandırmağa yönəlmiş fəaliyyətinin bəhrəsidir. Dövr baxımından, sözün əsl mənasında, qəhrəmanlığa bərabər belə bir addım məhz gələcəyin müstəqil, yeni Azərbaycanı naminə atılmışdı. Ana dilinin idarəçilikdə geniş tətbiqi, demək olar ki, bütün böyük klassiklərin SSRİ miqyasında yubileylərin keçirilməsi, bu tədbirlərin əksəriyyətinin Azərbaycan dilində baş tutması Azərbaycan elminin, ədəbiyyatının və dilinin inkişafına yönəlmişdi. Bütün bunları Heydər Əliyevin gələcək milli *"azərbaycançılıq fəlsəfəsi"*nin təməlində dayanan siyasətinin parlaq praktiki elementərindən hesab etmək olar.

Heydər Əliyev 1972-ci ildə Aşıq Ələsgərin anadan olmasının 150 illiyi münasibətilə keçirilən təntənəli yubileydəki çıxışında belə deyirdi:
*"Bu gün mən bir daha ürəkdən inandım və fəxr etdim ki, bizim çox dərin, zəngin mənalar ifadə etməyə qüdrəti olan, lakin eyni zamanda, həm də çox gözəl incə və ahəngdar Ana dilimiz, Azərbaycan dilimiz var..."* (Heydər Əliyevin 1972-ci il 9 iyundakı çıxışından).
Burada qeyd ediləsi çox vacib tarixi fakt vardır. Bu fakt fəxarət duyğusu ilə qeyd edilməlidir. Bilavasitə Heydər Əliyevin təşəbbüsü və rəhbərliyi ilə hələ 1970-ci illərdən başlanmış bu əhəmiyyətli proses 1995-ci ildə uğurla həyata keçirildi. 1995-ci ildə Azərbaycan dilinə müstəqil Azərbaycan Respublikasının dövlət dili statusu verildi. Ana dili cəmiyyət həyatının bütün sahələrində o cümlədən xüsusilə dövlət idarəçiliyində özünün layiqli yerini tutdu. *"Bu Azərbaycan dilinin inkişafı, dövlət dili statusu alması uğrunda Heydər Əliyevin çoxillik və gərgin fəaliyyətinin ən yüksək zirvəsidir"* (Mehdiyev, R. 1996).

## 5.2.Mədəniyyətin inkişafı - *"Azərbaycançılıq fəlsəfəsi"*nin digər strateji planı

Heydər Əliyevin rəhbərlik etdiyi illər ərzində Bakıda çox böyük abadlıq işləri görülmüş, müasir milli memarlığın görkəmli əsərləri sayılan, Azərbaycanın sosial və mədəni həyatında böyük əhəmiyyəti olan bir sıra memarlıq ansamblı, inzibati mərkəz, saray, institut, nəşriyyat, tədris korpusu, kompleks və özünün görkəmi ilə şəhərə rövnəq verən neçə-neçə binalar tikilib istifadəyə verilmişdir. Məhz Heydər Əliyevin təşəbbüsü sayəsində çox sayda memarlıq abidəsinin bərpası mümkün olmuşdur. O, Azərbaycan xalqının tarixi keçmişində, mənəvi mədəniyyəti tarixində iz qoymuş böyük şəxsiyyətlərin abidəyə çevrilməsinin xalqın milli varlığına, milli duyğularının güclənməsinə son dərəcə müsbət təsir edəcəyini çox gözəl bilirdi. Heydər Əliyevin mədəniyyətimizə, tariximizə dərin ehtiram nümayiş etdirərək

göstərdiyi qayğı sayəsində Bakının ən görkəmli yerlərində xalqımızın milli varlığının daşıyıcısı olan Füzuli, Nəsimi, N.Nərimanov, C.Cabbarlı, S.Vurğun kimi böyük şəxsiyyətlərin əzəmətli heykəlləri ucaldılmış, məşhur tarixi və ədəbi simaların hər biri üçün sanballı mədəniyyət mərkəzinə çevrilən ev-muzeyləri yaradılmışdır. O öz rəhbərliyi dönəmində klassik mədəniyyət irsinə münasibətdə də aydın, obyektiv mövqe nümayiş etdirmişdir.

Heydər Əliyev respublikaya rəhbərlik etməyə başladığı ilk gündən Azərbaycan mədəniyyətinin görkəmli şəxsiyyətlərinin, o cümlədən, böyük filosofların, şair və ədiblərin yubileylərinin müntəzəm surətdə qeyd olunması bir ənənə halını almış, bu da Azərbaycan xalqının ümummilli problemləri ilə sıx bağlı olub, milli ruhun, milli özünüdərkin yüksəlişi, xalqın tarixi yaddaşının özünə qaytarılması və müstəqil dövlətçilik ideyalarının gerçəkləşməsi üçün zəmin yaratmışdır.

Hələ SSRİ dövründə Azərbaycan mədəniyyətinin ümumittifaq miqyasında ön mövqelərə çıxması, elmi, ədəbi, mədəni abidələrin planlı tədqiqi və nəşri Heydər Əliyevin *“azərbaycançılıq fəlsəfəsi”*nin məhsulu idi. Mədəniyyətin inkişafına dair onun imzası və əməyi ilə gerçəkləşən bəzi faktları qeyd edirik:

**5.2.1.**Heydər Əliyev Azərbaycanın milli-mədəni irsinə və aliminə də sahib çıxır, onları təbliğ və təqdim etməyi özünə vəzifə bilirdi. Nəsirəddin Tusi Heydər Əliyevin nadir Azərbaycan dahilərindən biri hesab etdiyi alim-mütəfəkkir idi. Heydər Əliyev N.Tusi haqqında ən müxtəlif məqamlarda çox maraqlı fikirlər söyləmiş, onun Azərbaycan elmində, Şərq düşüncəsində və dünya elm tarixindəki mövqeyini dəfələrlə yüksək qiymətləndirmişdir. 2001-ci ildə dahi Azərbaycan alimi və mütəfəkkiri N.Tusinin anadan olmasının 800 illiyi tamam olurdu. O, bu əlamətdar münasibətlə, 800 illik yubileyin hazırlanması və təntənəli keçirilməsi haqqında fərman imzalamış, Dövlət Komissiyası yaratmış, və özü birbaşa həmin komissiyanın sədri kimi çox məsuliyyətli və şərəfli vəzifəni öz üzərinə götürmüşdü. Bu yubileyin dünya miqyasında keçirilməsi barədə *YUNESKO*-nun qərar qəbul edilməsində önəmli rol oynamışdı. Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin fərmanında Nəsirəddin Tusi haqqında belə qeyd olunurdu:

> *“Nəsirəddin Tusi özündən sonra olduqca böyük elmi irs qoyub getmişdir. Onun əsərləri dünya xalqlarının bir çox dillərinə tərcümə edilərək dəfələrlə çap olunmuş, neçə-neçə alimlər nəslinin yetişməsində müstəsna rol oynamışdır. Təəssüflə qeyd edilməlidir ki, Nəsirəddin Tusinin çoxsahəli yaradıcılığı ölkəmizdə hələ lazımi səviyyədə tədqiq olunmamışdır. Mütəfəkkir alimin irsinin dərindən öyrənilməsi*

*Azərbaycan elmi qarşısında duran vacib məsələlərdəndir”* (Əliyev, Heydər. 13 iyun 2000-ci il).

**5.2.2.**Zəmanəsinin qüdrətli dövlətlərindən olan SSRİ-də dahi Füzuli haqqında tədqiqatlar əsasən Azərbaycanda aparılmışdır. 1996-cı ildə Füzulinin 500 illiyi münasibətilə keçirilmiş Beynəlxalq simpoziumu da Azərbaycanın elmi-ədəbi həyatı üçün əlamətdar olmuşdur. Simpoziumun plenar iclasında və bölmələrində dünya füzulişünaslığının 32 ölkədə fəaliyyət göstərən 70 nümayəndəsi məruzə ilə çıxış etmişdir. Füzulinin 500 illik tədbirlərinin miqyası isə çox geniş olub, Türkiyənin Ankara və İstanbul şəhərlərini, Rusiyanın Moskva və Sankt-Peterburq şəhərlərini, İranın Tehran və Təbriz şəhərlərini, İraqın Bağdad, Kərbəla, Kərkük şəhərlərini əhatə etmiş, Parisdə YUNESKO-nun baş qərargahında, Tiflisdə, Daşkənddə, Dərbənddə, Mahaçqalada və onlarla digər məntəqələrdə geniş qeyd olunmuş, bu tədbirlərin hər birində müstəqil Azərbaycan Respublikasını təmsil edən nümayəndə heyətləri iştirak etmişlər. Füzulinin xatirəsi bir sıra beynəlxalq forumların, o cümlədən, Türk dünyası yazıçılarının 3-cü qurultayının, Türksoy təşkilatının 8-ci toplantısının, eləcə də Bakıda keçirilmiş Beynəlxalq simpoziumun diqqət mərkəzində olmuşdur. Bu tədbirdə füzulişünaslıq elminin bütöv bir əsr ərzində (XIX əsrin sonlarından XX əsrin 90-cı illərinədək) əldə etdiyi nailiyyətlər öz elmi yekunlarını tapmış, dahi sənətkarın parlaq irsinin XXI əsrdə tədqiqinə dair konkret istiqamətlər müəyyən edilmişdir.

1994-cü ildə M.Füzulinin 500 illik yubileyini keçirmək haqqında qərar qəbul etmək ərəfəsində Heydər Əliyev bu böyük tədbirin tarixi məna və əhəmiyyəti barədə düşünmüşdü. Heydər Əliyev müdrik siyasətçi və dövlət xadimi kimi, gələcəyi görür, tarixin bu keçid dövründə- mənəviyyatın və mədəniyyətin müəyyən dərəcədə sıxıntılara məruz qaldığı vaxtda belə bir yubileyin təşkilini insanların batini həyatını, zənginləşdirəcəyini anlayırtdı. Yubileyin keçirilməsi bir tərəfdən yubilyarın xalq və dünya qarşısında xidmətlərini bir daha təbliğ və nümayiş etdirmək, digər tərəfdən isə müasir nəslin ona bəslədiyi ehtiramı bildirmək idi.

Məhəmməd Füzuli kimi şəxsiyyəti olan xalq fəxr edə bilər. Həqiqətən də dünya birliyində, dünya xalqları arasında tariximizi, mədəniyyətimizi, milli ənənələrimizi təbliğ etmək, yaymaq üçün belə yubileylər həmişə böyük bir fürsətdir. Öncəliklə, Füzuli özünün yaradıcılığına, ədəbi, elmi və fəlsəfi irsinə görə buna layiqdir və Azərbaycan xalqının çağdaş nəsli ona öz minnətdarlığını bildirməlidir. İkincisi, bu yubileyi keçirərkən, biz xalqımızın özünü daha dərindən tanımasını təmin etməli idik. Xalq gərək daim öz kökünü xatırlasın, tarixini öyrənsin, milli mədəniyyətindən, elmindən heç

vaxt ayrılmasın. Beləliklə də, Heydər Əliyev dövlət yubiley komissiyasının üzvləri, elmi müəssisələr, yaradıcılıq təşkilatları, Mədəniyyət nazirliyi, Xarici işlər nazirliyi və yerli icra orqanları qarşısında vəzifə qoyur və bu tədbirlər vasitəsi ilə Azərbaycan xalqını dünyaya daha yaxından tanıtmağı onlardan tələb edirdi. Qoy dünya bilsin ki, xalqımızın çoxəsrlik, zəngin və tarixi mədəniyyəti var. Azərbaycanın bugünkü mədəniyyəti dahi şəxsiyyətlərimizin yaratdığı və əsrlərdən-əsrlərə keçən mədəniyyətimizə əsaslanır. Bu, həmçinin düşmən qüvvələrin guya Azərbaycan xalqının zəngin tarixinin və kökünün olmadığını daim sübut etmək səylərilə mübarizə aparmaq üçün lazım idi. Şübhəsiz ki, bi iddialar cəfəngiyyatdır. Lakin xalqımıza düşmən olan, respublikamızı parçalamaq və onun ərazisini qəsb etmək, müstəqilliyinə qəsd etmək istəyən dairələr, qüvvələr, bəzən də millətlər əvvəllər olduğu kimi, bu gün də guya Azərbaycan xalqının tarixi köklərə malik olmadığını iddia etməyə cəhd göstərirlər.

Heydər Əliyevin böyük şair və ədib Füzuli haqqında qənaətləri 1996-cı il noyabrın 8-də “Füzuli-500” yubileyinin Bakıda keçirilmiş təntənəli zirvə tədbirindəki nitqində öz əksini tapmışdır. O, öz nitqində Füzuli sənətinin fəlsəfi mahiyyəti üzərində geniş dayanır və şairin poetik irsində fəlsəfənin bir çox sahəsində öz əksini və maraqlı şərhini tapdığını göstərirdi. Füzuli özünəqədərki dövrün Şərq və Qərb fəlsəfi qənaətlərini dərindən öyrənib öz əsərlərində ümumiləşdirmiş, bu zəmində də zəmanəsinin fəlsəfi fikrinin zirvəsinə yüksəlmişdir. Heydər Əliyev Füzuli yaradıcılığının mahiyyətini onun insani münasibətləri- sevgi, sədaqət və etibarı, vətən məhəbbətini, yorulmadan valideynə ehtiramı yüksək bədii səviyyədə tərənnüm və təcəssüm etməsində görürdü. O, belə hesab edirdi ki, bir sıra əsərlərini fars və ərəb dillərində yazmış şairin bizim üçün ən əhəmiyyətli xidməti poetik irsinin həcmcə ən böyük hissəsini türk dilində, doğma Azərbaycan dilində yazmasıdır. Türkcə “Divan”ı və “Leyli və Məcnun” məsnəvisi ilə Füzuli ana dilimizə yeni pərvəriş vermiş, Azərbaycan şeir dilini uca zirvələrə qaldırmışdır.

Füzuli irsinin Azərbaycan mənəviyyatı ilə üzvi surətdə qaynayıb-qarışdığından bəhs edən Heydər Əliyev çox maraqlı bir bədii müqayisədən istifadə edərək göstərirdi ki, ölməz şair əsərləri ilə özünə vüqarlı bir heykəl ucaltmışdır. Bu abidə 500 ildir ki, hər bir azərbaycanlının, hər bir türkün qəlbindədir. Bu yenilməz mənəvi abidə bütün fırtınalardan, zəlzələlərdən keçərək yaşayır, gündən-günə yüksələrək insanların mənəviyyat aləmində yeni zirvələr fəth edir.

Füzuli yaradıcılığının əbədiyaşar keyfiyyətini şərh edən Heydər Əliyev onun haqlı olaraq müasir dünyamızla üzvi əlaqələrini açıqlayır. “Füzuli-500”

tәdbirinin xalqımızın mәnәvi hәyatını daha da zәnginlәşdirdiyini, vәtәndaşları ruhlandırdığını, onları Vәtәnә, torpağa sәdaqәt ruhunda tәrbiyәlәndirdiyini göstәrir vә *"Azәrbaycan Respublikasının әrazi bütövlüyünü bәrpa etmәk, işğal olunmuş torpaqları azad etmәk üçün hamımızı sәfәrbәr edir. Biz bu gün dә, gәlәcәkdә dә öz hәyatımızda, öz işimizdә M.Füzulinin yaratdığı mәnәvi dәyәrlәrdәn istifadә edәrәk xalqımızı xoşbәxt gәlәcәyә aparacağıq"* (Heydәr Əliyev; Tәrt.: V.Quliyev. 1999. s.386)- deyә qeyd edirdi.

Heydәr Əliyevin böyük şair haqqında mülahizәlәri arasında beynәlxalq münasibәtlәr baxımından әhәmiyyәt kәsb edәn mәqamlar da çox idi. İlk dәfә mәhz Heydәr Əliyev dövlәtlәrarası münasibәtlәr müstәvisindә çox vacib belә tezis irәli sürәrәk ciddi arqumentlәrlә Füzulinin keçmişdә dә türklәri birlәşdirәn bir şәxsiyyәt olduğunu әsaslandırmışdır. XX әsrdә türk dünyası parçalanmış olduğu bir halda, türk dünyasına mәnsub ölkәlәrin, demәk olar ki, tam әksәriyyәtinin (Türkiyәdәn başqa) onların hәyatına, tarixinә, adәt-әnәnәsinә uyğun olmayan rejimlәr içәrisindә yaşadığı vaxtda Füzuli bizi yaşadaraq, bu günlәrә gәtirib çıxarmışdır. Heydәr Əliyev iftixar duyğusu ilә deyirdi ki, bu gün biz hәm Azәrbaycanda, hәm Füzulinin doğulduğu yerdә-Bağdadda, hәm dә Ankarada Füzulinin 500 illiyini qeyd edәrkәn, artıq keçmişdәki kimi parçalanmış vәziyyәtdә deyilik. İndi böyük Türkiyә Cümhuriyyәti ilә yanaşı, digәr türk cümhuriyyәtlәri dә vüqarla dayanmışdır. Ay-ulduzlu Türkiyә bayrağının yanında indi artıq beş müstәqil türk cümhuriyyәtinin dә bayraqları dalğalanır. Bunlardan biri dә Azәrbaycan bayrağıdır. Tamamilә tәbiidir ki, Mәhәmmәd Füzulinin 500 illik yubileyi ilә bağlı öncәdәn xüsusi sәriştә ilә planlaşdırılıb hәyata keçirilәn tәdbirlәr dә Azәrbaycan mәnәviyyatında parlaq iz qoymuşdur.

Bu münasibәtlә dahi sәnәtkarın әsәrlәri yüksәk sәviyyәdә yenidәn nәşr edilmiş, alimlәrin Füzulinin hәyat vә yaradıcılığına hәsr olunmuş yeni tәdqiqatları işıq üzü görmüş, yubiley münasibәtilә Azәrbaycanın bütün bölgәlәrindә, hәmçinin Ankarada, İstanbulda, Tehranda, Tәbrizdә, Bağdadda, Kәrkükdә, Parisdә, Moskvada, Pekindә yığıncaqlar, elmi sessiyalar, beynәlxalq simpoziumlar keçirilmiş, "Füzuli-500" mövzusunda sәrgi tәşkil olunmuşdur. Nәhayәt Bakıda, Respublika sarayında dünya miqyaslı tәntәnәli zirvә tәdbiri keçirilmiş, regionun bәzi dövlәt başçıları da sanballı nümayәndә heyәtlәri ilә birlikdә hәmin tәdbirә qatılmışdılar. Bu münasibәtlә işıq üzü görmüş Füzuli külliyyatını xüsusi qeyd etmәk lazımdır. Şairin elm alәminә mәlum olan istisnasız olaraq bütün әsәrlәri ilk dәfә 6 cild hәcmindә kütlәvi tirajla nәşr edilmişdir. Akademik Hәmid Araslının, prof. Hәmid Mәmmәdzadәnin elmi-tәnqidi mәtni әsasında işıq üzü görәn bu altıcildlik

Füzuli əsərləri ilk və ən mükəmməl akademik nəşr kimi ədəbiyyatşünaslıq elminin tarixində həqiqətən əlamətdar hadisədir. Azadə Rüstəmin “Mütəfəkkir mövlana Füzuli”, Sabir Əliyevin “Füzulinin nəzəri-bədii düşüncələri”, Vəcihə Feyzullazadənin “Füzulinin ömür yolu”, Ayaz Vəfalının “Füzuli xəlqiliyi”, Lalə Əlizadənin “Füzulinin gizli sözü”, Leyli Əliyevanın “Füzuli ingilis şərqşünaslığında” monoqrafiyalarında, habelə, M.F.Körpülüzadə, Həmid Araslı, Mir Cəlal Paşayev, Məmməd Cəfər Cəfərov kimi görkəmli füzulişünasların yenidən çap olunmuş tədqiqatlarında dahi şairin bütün zamanlar üçün qiymətli olan irsi ən müxtəlif istiqamətlərdə araşdırılmışdır. “Füzuli əsərlərinin izahlı lüğəti”ndə şairin poetik əsərlərində işlətdiyi bütün sözlər əhatə olunmuşdur. Ayrı-ayrı yuvacıqlar kimi təqdim edilən mikroməqalələrdə hər bir sözün Füzuli dilindəki əlvan səciyyəvi mənaları üzə çıxarılmışdır. Şairin poetik təxəyyülünün və sənətkar istedadının təcəssümü olan sözlər və sözə ekvivalent olan söz birləşmələri və tərkibləri bu lüğətdə özünün mötəbər şərhini tapmışdır.

**5.2.3.**Məhəmmədhüseyn Şəhriyar Heydər Əliyevin ən çox sevdiyi və ədəbi irsini yüksək qiymətləndirdiyi böyük şairlərdən biri idi. Heydər Əliyev şairin 90 illik yubileyi münasibəti ilə təşkil olunmuş təntənəli mərasim iştirakçılarına ünvanladığı 11 aprel 1998-ci il tarixli təbrikində ilk olaraq onu böyük vətənpərvərlik duyğularının tərənnümçüsü olan filosof-şair kimi göstərmiş, xüsusi iftixar duyğusu ilə Şəhriyarın irsinin onun yaşayıb-yaratdığı zamanın ictimai-siyasi, fəlsəfi və ədəbi görüşlərinin parlaq inikası olaraq təqdim etmişdir.

> *“Şair xalq həyatının dərinliklərinə enib dövrün kəskin ictimai ziddiyyətlərini, şərin, mütləqiyyətin, ədalətsizliyin, mənəvi məhkumiyyətin faciələrini poeziyanın rəvan, aydın və təsirli dili ilə bütün dünyaya car çəkmişdir”* (Həbibbəyli, İsa və başqaları, 2018. səh 346).

Şəhriyar yaradıcılığının zəmanəmiz üçün xüsusi əhəmiyyətli olan bir məqamı- Heydər Əliyevin haqlı qənaətinə görə- şairin Azərbaycan və İran xalqları arasındakı ədəbi, elmi və mədəni əlaqələrin inkişafındakı böyük xidmətləridir. Şəhriyar sənətini Firdovsi, Xəyyam, Qətran Təbrizi, Xaqani, Nizami, Sədi, Nəsimi, Hafiz, Füzuli kimi dühaların yaradıcılıq incilərinin işığı altında nəzərdən keçirən Heydər Əliyev onlarla eyni sırada olan Şəhriyarın da Şərqin çox geniş bir regionunda insan mənəviyyatının zənginləşməsində böyük rol oynadığını vurğulayırdı.

**5.3.*“Azərbaycançılıq fəlsəfəsi”*nin strateji planı kimi milli-mənəvi dəyərlərin və adət-ənənələrin qorunub saxlanması**

Heydər Əliyev *“azərbaycançılıq fəlsəfəsi”*nin əsas strateji istiqamətlərindən biri kimi milli-mənəvi dəyərlər və adət-ənənələrin qorunub

saxlanmasına xüsusi diqqətlə yanaşırdı. Akademik Bəkir Nəbiyev özünün “Heydər Əliyev haqqında etüdlər” əsərində birbaşa Heydər Əliyevdən nəql edir ki, 1994-cü ildə Məkkə ziyarətinə gedərkən, belə demişdir: *“Anası İzzət xanım onun həyatının ən əlamətdar məqamları ərəfəsində ona Allah kəlamı ilə xeyir dua verər və evdən çıxanda onu Quran altından keçirərmiş...”* (Nəbiyev, Bəkir. 2007, səh 11). Bütün bunların nəticəsi kimi Heydər Əliyev 2002-ci ildə Bibiheybet ziyarətgahındakı çıxışında İslam və Aşura haqqında dərinmənalı nitq söyləmişdir: *“Biz bundan sonra da Qurani-şərifin, həzrət Muhəmməd (s) peyğəmbərin qoyduğu yol ilə gedəcək və haqq-ədalət və Vətən yolunda şəhid olmuş Həzrət İmam Hüseynin (ə) və onun bütün silahdaşlarının qəhrəmanlığını, şəhidliyini heç vaxt unutmayacağıq”* (Heydər Əliyevin 2002-ci ildə Bibiheybetdəki çıxışından). Heydər Əliyev Aşura və bu növ mərasimlərin keçirilməsini İslam dininə ehtiram nümunəsi, milli-mənəvi dəyərlərin və adət-ənənələrin qorunub saxlanması olduğunu ifadə edir və sanki gələcək Vətən müharibəsi üçün müqəddəs məqam olduğunu göstərirdi. Göründüyü kimi Heydər Əliyev öz fikirlərini milli-mənəvi dəyərlər köntekstində gözəl şəkildə bəyan etmişdir. Sadəcə bu fikirə nəzər salmaqla Heydər Əliyevin bu barədə uca və ali bir fikirə sahib olduğunu görmək mümkündür.

**5.3.1.**“Kitabi-Dədə Qorqud”-un müqəddiməsində deyilir:

> *“Məhəmməd peyğəmbərin zamanına yaxın Bayat boyunda Qorqud ata deyilən bir kişi vardı. O kişi... nə deyirdisə olurdu. Gələcəkdən qəribə xəbərlər söyləyirdi. Allah onun könlünə ilham vermişdi. Qorqud ata Oğuz xalqının çətin işlərini həll edərdi... O, nə buyursa, qəbul edərdilər. Onun sözünü tutub gedərdilər”* (Transliteriya və qeydlər: Məlikov, Ə. 2020. s.19-20).

Bunları oxuyanda və ümummilli lider Heydər Əliyevin tərcümeyi-halının zəngin faktları və xalq qarşısında tarixi xidmətləri ilə müqayisə edəndə görürük ki, bu müqayisədə demək olar ki, çox şey üst-üstə düşür. İllər öncə müstəqil Azərbaycanın bu günü barədə nəhəng Bakı-Tbilisi-Ceyhan neft boru kəməri, onun iqtisadiyyatımızın inkişafında əvəzedilməz rolu və yaxud “Biz doğma Qarabağa qayıdacağıq” və Qarabağın azad edilməsi haqqında deyilənlərin hamısı gerçək olmadımı?

Heydər Əliyev deyirdi ki, qəhrəmanlıq eposu olan “Kitabi-Dədə Qorqud” bir cəngavərin, bir igidin yox, bütöv bir xalqın qəhrəmanlığını özündə toplayan bir əsərdir. Onun ən böyük ideyası baş sərkərdədən tutmuş, böyükdən kiçiyə kimi bütün qəhrəmanlarının doğma torpaqları qorumaq uğrunda canlarından keçməyə daim hazır olduğunu göstərməkdir. Ölkəmizin yaşadığı hazırkı mərhələdə xalqımızın qarşısında duran ən ümdə

problemlərin həlli, o cümlədən, respublikamızın suverenliyinin və müstəqilliyinin möhkəmləndirilməsi, ərazi bütövlüyünün qorunması baxımından Azərbaycan Respublikası vətəndaşlarının bu qəhrəmanlıq ideologiyasından faydalanmasına Heydər Əliyev çox böyük əhəmiyyət verirdi. O, bu mülahizələri ilə vətən övladlarını erməni təcavüzkarları tərəfindən işğal olunmuş torpaqları qaytarmaq üçün yurd təəssübkeşliyinə, doğma Qarabağ uğrunda mübarizəyə, oğuz igidləri kimi qələbə çalmağa, lazım gələrsə, bu yolda canlarından keçməyə hazır olmağa təşviq edirdi. Təbiidir ki, “Kitabi-Dədə Qorqud” dastanının 1300 illik yubileyi Heydər Əliyevin şəxsi təşəbbüsü və böyük səyi ilə həyata keçirilmiş və Azərbaycan ədəbiyyatı, elmi və mədəniyyəti sahəsində mühm və əlamətdar bir hadisə kimi tarixə düşmüşdür. Akademik Nizami Cəfərov bu barədə ümumi qənaətini belə ifadə etmişdir: “müəllifi Azərbaycan xalqının özünün olduğu belə bir eposun yubileyinin keçirilməsini milli ideologiynın həqiqi təntənəsi oldu” (Nəbiyev, Bəkir. 2007. səh 33). Ədalət naminə etiraf etmək lazımdır ki, “Kitabi-Dədə Qorqud”la bağlı görülən tədbirlərə ən düzgün, əsaslandırılmış qiyməti də o zaman Heydər Əliyev özü vermişdi. Dastanın yubileyi münasibətilə 9 aprel 2000-ci ildə Bakıda keçirilən zirvə toplantısındakı nitqində Heydər Əliyev deyirdi:

> *“... Azərbaycanda «Kitabi-Dədə Qorqud» irsinin öyrənilməsi, tədqiq edilməsi, təbliğ olunması sahəsində böyük işlər görülmüş və bunlar «Kitabi-Dədə Qorqud»u bizim xalqımıza, türk dünyasına, türkdilli xalqlara yenidən tanıtmış və onun nə qədər zəngin sərvət oluğunu bütün dünyaya nümayiş etdirmişdir”* (11 aprel 2000-ci il, “Azərbaycan” qəzeti).

Nəticədə Prezident fərmanı əsasında çox geniş miqyasda “Kitabi-Dədə Qorqud”a dair araşdırmalar öz səmərəsini vermiş və bu fərman sanki təkan rolunu oynamışdı.

**5.3.2.**Heydər Əliyev filosof təfəkkürlü böyük şair və dramaturq Hüseyn Cavidi də çox sevir və onu öz nitqlərində, imzası ilə təsdiq olunmuş qərar və sərəncamlarda onun ölməz ədəbi irsini müxtəlif yönlərdən böyük məharətlə təhlil edirdi. Cavidşünaslığın vacib problemlərini araşdıranlar zaman keçdikcə Heydər Əliyevin bu mülahizələrinə dəfələrlə müraciət edərək, onlardan faydalanacaqlar. Lakin, Hüseyn Cavidin xatirəsinin əbədiləşdirilməsi sahəsində Heydər Əliyevin cəsarətlə irəli sürüb böyük əzmkarlıq və müdrik ardıcıllıqla həyata keçirdiyi təşəbbüs tarix boyu xalqın milli-mənəvi dəyərləri və adət-ənənələrin qorunub saxlanması zəminində həmişə yaşayacaq, həm böyük sənətkar Hüseyn Cavidi, həm də ulu öndər Heydər Əliyevi şərəfləndirəcəkdir. Heydər Əliyevin nəzərində H.Cavid Azərbaycan ədəbiyyatı və mədəniyyətinin inkişafında misilsiz xidmətlər

göstərmiş dahi bir sima idi. Ümummilli lider iftixar duyğusu ilə etiraf edirdi ki, *"H.Cavidin yaratdığı əsərlər Azərbaycan xalqlının milli sərvətidir. Onlar bu gün üçün, gələcək nəsillər üçün dərs kitabıdır"*. Heydər Əliyev bu ölməz sənətkarın bütün yaradıcılığının Azərbaycan xalqını milli azadlığa və müstəqilliyə çağırıdığını onun ibrətamiz həyat yolundan və dərindən bələd olduğu əsərlərindən gətirdiyi nümunələrlə əsaslandırırdı. Ədib həmişə öz iradəsi ilə yaşamış, öz xalqına sadiq olmuşdur, xalqını həddindən artıq sevmiş və ona yetərincə xidmət etmişdir. Bütün bu deyilənlərə əsasən Heydər Əliyev kimi əsl vətənpərvər bir Azərbaycan rəhbəri, hətta ölkəmiz Sovet İttifaqının tərkibində olduğu dövrdə də 1930-cu illər repressiyasında olmazın əzab və işgəncələrə məruz qalmış H.Cavidin qərib məzarının uzaq Sibirdə on minlərlə günahsız və kimsəsiz əzabkeşin məzarı kimi baxımsız qalması ilə barışa bilmirdi. Buna görə ümummilli lider 1982-ci ildə o zaman üçün bütün SSRİ-də analoqu olmayan böyük iradə və məsuliyyət tələb edən tarixi bir qərar qəbul edir. H.Cavidin cənazəsi "Sibir mədənləri dərinliyindəki" katorqa məzarlığından Azərbaycana gətirilir və Naxçıvanda, vaxtilə cavidlərin məskun olduğu ata-baba mənzilinin təqribən 100 addımlığında torpağa tapşırılır. 15 il sonra H.Cavidin məqbərəsinin təntənəli açılışı mərasimində Heydər Əliyev H.Cavidin cənazəsini uzaq Sibirdən Azərbaycana gətirməyin heç də asan başa gəlmədiyini kövrələrək xatırlamışdı:

> *"Bu, böyük iradə, cəsarət tələb edirdi. Ancaq xalqımıza, millətimizə, tariximizə, mədəniyyətimizə, ədəbiyyatımıza, mənəviyyatımıza olan sədaqət mənə belə bir cəsarət göstərməyə imkan verdi. Mən bunu etdim..."*
> (Heydər Əliyevin 29 oktyabr 1996-cı ildəki nitqindən).

Bu gün H.Cavidin həm də böyük bir memarlıq sənəti nümunəsi olan məqbərəsi təkcə onun həmvətənlərinin deyil, xarici ölkələrdən, o cümlədən də Türkiyədən və Yaxın Şərqdən gələn saysız-hesabsız ədəbiyyatsevərlərin ziyarətgahına çevrilmişdir.

**6.Nəticə**

Heydər Əliyev ağır müharibə şəraitində yaşayan, erməni işğalçılarına qarşı mübarizə aparan Azərbaycanın ən çətin məqamlarında ölkənin xilas yollarını yalnız hərbi qüdrətin artırılmasında deyil, həm də xalqın milli-mənəvi dəyərlər və adət-ənənələr baxımından çox güclü olan potensialında, Azərbaycanın zəngin və orijinal mədəniyyət yurdu olmasında görür, klassiklərin milli-mənəvi dəyərlərinin və adət-ənənələrinin bənzərsiz irsini ən müxtəlif vasitələrdən istifadə edərək dönə-dönə dünya miqyasına çıxarmaqla doğma yurdumuzu bəşəriyyətə olduğu kimi tanıtmağa çalışırdı. Bu isə öz növbəsində gecə-gündüz Azərbaycana, onun fəlsəfəsinə, tarixinə,

mədəniyyətinə, ədəbiyyatına qarşı böhtanlar püskürən erməni təxribatını tərksilah etmək, ona çox böyük zərbə vurmaq demək idi. O dövrdə də, hazırda da bəzi ağzıgöyçəklər olub və var ki, görkəmli elm, fəlsəfə, ədəbiyyat, mədəniyyət və incəsənət xadimləri üçün yubiley tədbirləri keçirilməsinin məna və əhəmiyyətini gözdən salmağa çalışırlar. Onlar başa düşmək istəmirlər ki, bu tədbirlər yubileyləri qeyd olunan alim, ədib, incəsənət xadimləri ilə yanaşı, lakin onlardan daha artıq xalqımıza, cəmiyyətimizə lazımdır. Bizdə bir qayda olaraq mütəşəkkil və yüksək elmi, fəlsəfi, ədəbi, mədəni səviyyədə keçirilən bu tədbirlər xalqın öz böyük istedadlı övladları üçün iftixar duyğusunu qüvvətləndirir, dünya ictimaiyyəti qarşısında Azərbaycanın imicini yüksəldir, ölkəmiz və xalqımız, tarix və mənəviyyatımız haqqında yalanlar püskürən düşmənlərin bədxahlıqlarına tutarlı cavab verir. Bu qəbildən olan tədbirlər alimlərin də potensial imkanlarını üzə çıxarır, onların araşdırmalarına mütəşəkkillik verir, ictimai və humanitar elmlərin tarixində əlamətdar olan nəticələrə gətirib çıxarır.

Yekunda qeyd ediləsi əsas fikir budur ki, Heydər Əliyev vətənin çətin günündə o fəlsəfənin gücü ilə ölkəni yenidən formalaşdıra bildi. O, bunu belə vurğulayırdı: *“Özümü xoşbəxt hesab edirəm ki, Azərbaycanın ağır, çətin və müqəddəratı həll edildiyi bir məqamda mənə üz tutuldu, mənə müraciət edildi. Mən öz vətənimə oğulluq borcumu yerinə yetirdim, sədaqətimi bir daha nümayiş etdirdim. Özümü oda atdım, alova atdım və Azərbaycanı bu ağır vəziyyətdən birləşib çıxara bildik. Həmin o ağır ildə Azərbaycan xalqı məni özünə prezident seçdi”*. Heydər Əliyev bir filosof timsalında və onun müəllifi olduğu *“azərbaycançılıq fəlsəfəsi”* müstəqil Azərbaycan Respublikasında özünü təzahür və təcəssüm etdirir. Heydər Əliyevin siyasi, iqtisadi, ictimai və mədəni həyatın bütün sahələrində həyata keçirdiyi planlar artıq *“azərbaycançılıq fəlsəfəsi”*nin gerçəkləşməsinə bir sübutdur. Onun şəxsiyyəti də, fəaliyyəti də Azərbaycan tarixinin ayrılmaz bir hissəsini təşkil edir. Aydındır ki, bütün bugünkü nailiyyətlər və bundan sonrakı dövrlərdə qazanılacaq uğurlar da Heydər Əliyevin yaratmış olduğu möhkəm bünövrəyə əsaslanır. Bu gün hər bir azərbaycanlının taleyində ulu öndər Heydər Əliyev dühasının öz təsiri və zərrəsi mövcuddur.

# ƏDƏBİYYAT


1. Məlikov, Ə., & Əmirov, E. (2020). Rəhbər və başçı: fərq nədir? (Tarixi-politoloji nəzər). *Elm və Həyat jurnalı (ISSN:2710-0944), №4 (470)*. səh.25-31. http://dx.doi.org/10.13140/RG.2.2.22196.37763
2. Mədətli, E. (2020). Heydər Əliyevin azərbaycançılıq fəlsəfəsi və müstəqil dövlət quruculuğu. *"Heydər Əliyevin siyasi irsi və azərbaycançılıq" toplusu*. Bakı, Elm və Təhsil nəşriyyatı.
3. Heydər Əliyev, "Müstəqillik yolu", Seçilmiş fikirlər. Buraxılışa məsul: Ramiz Mehdiyev. Bakı, 1997. http://ebooks.preslib.az/pdfbooks/azbooks/independ.pdf 2
4. *Azərbaycan Respublikasının Konstitusiyası*, (tərcüməçi: Əlǝddin Məlikov). Bakı, Elm və Təhsil nəşriyyatı, 2019, 84 səh. səh. 26, (http://dx.doi.org/10.33864/MTFZK.2019.32)
5. *Heydər Əliyev 9 noyabr 2001-ci ildə Dünya azərbaycanlılarının I qurultayındakı çıxışından.* https://files.preslib.az/projects/diaspora/b1.pdf
6. Firidun bəy Köçərli, (1913). "Ana dili", *Molla Nəsrəddin jurnalı, № 22.*
7. Heydər Əliyev 1972-ci il 9 iyun. *Azərbaycan Dövlət Opera və Balet Teatrında Aşıq Ələsgərin anadan olmasının 150 illiyi münasibətilə keçirilən yubileydəki çıxışından.*
8. Mehdiyev, R. (1996). Elmimizin və dilimizin xilaskarı. *"Azərbaycan" qəzeti*, 19 sentyabr.
9. Tərt.: Quliyev, V. (1999). *Ədəbiyyatın yüksək borcu və amalı: Nitqlər, məruzələr, çıxışlar*. Heydər Əliyev; Bib-ID. vtls000016460. Bakı: Ozan. 496 s.
10. Həbibbəyli, İ., & başqaları. (2018). *Ədəbiyyatda Heydər Əliyev obrazi tarixi gerçəklikdən ideala*. Bakı, Elm və Təhsil nəşriyyatı. səh 346
11. *29 oktyabr 1996-cı ildə Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin Naxçıvan şəhərində Azərbaycan şairi və dramaturqu, görkəmli ədib Hüseyn Cavidin məqbərəsinin təntənəli açılışı mərasimindəki nitqi.* (http://anl.az/el/emb/HuseynCavid/pdf/he_nitg-29.10.1996.pdf)
12. Nəbiyev, B. (2007). *Heydər Əliyev haqqında etüdlər*. Bakı, Çinar-Çap nəşriyyatı.
13. *"Azərbaycan" qəzeti*, 11 aprel 2000-ci il
14. *Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin 2002-ci ildə Bibiheybet ziyarətgahındakı çıxışından parça.* (https://www.youtube.com/watch?v=TUyuaa20Mdo) və (https://www.islamtimes.org/az/article/118707/heyd%C9%99r-%C9%99liyev-islam-v%C9%99-a%C5%9Fura)

**15.** Transliteriya və qeydlər: Məlikov, Ə. (2020). *“Kitabi-Dədə Qorqud”un Üçüncü-Günbəd Əlyazması.* Bakı, Kaspi nəşrləri, 55 səh. Səh.19-20. (http://dx.doi.org/10.13140/RG.2.2.10067.30243)

## Философия азербайджанства Гейдара Алиева

**Аладдин Маликов***

**Абстракт.** Сферой проявления философии является мышление. Само мышление появляется и отражается в разных формах, что способствует разному восприятию философии. Изучение и преподавание философии как науки является ее основным направлением, важным условием которого является раскрытие истины. На протяжении истории данный процесс проявлял себя вначале проявлением философии в теологии, а далее ее отражением в поэзии.

«Философия азербайджанства» Гейдара Алиева является дискурсом, направленным на формирование и развитие общества. Другим словом, общенациональный лидер направил философию на ее практическое внедрение в государственность и человеческую жизнь. Согласно нашим выводам, «философия азербайджанства» Гейдара Алиева являлась не только намерением, но и средством. База этой философии была заложена заранее, но ее полное формирование произошло в период независимости Азербайджана. Главными задачами в этой ситуации являлись - самосознание, самовозвращение и самовыражение.

Основой сущности «философии азербайджанства» является независимо от принадлежности и разномышленности народа сохранять и поддерживать основные традиции и культурное наследие. Именно такие усилия обеспечивают идеологическую безопасность общества и фактически предотвращают создание проблем и барьеров, блокирующих его развитие. Различные понимания глобализации, многокультурности и космополитизма Гейдар Алиев сочетал в едином понимании и воссоединял их в общей философии, которая именовалась «философией азербайджанства». Он в своих докладах и выступлениях,

* Доктор философии по философии, доцент,
Ведущий научный сотрудник Института Философии и Социологии НАНА; Баку Азербайджан
E-mail: aladdin.malikov@gmail.com
https://orcid.org/0000-0001-5830-6764

**Цитировать статью:** Маликов, А. [2023]. Философия азербайджанства Гейдара Алиева. *Журнал «Metafizika». 6(1),* с.10-32.

**История статьи:**
*Статья поступила в редакцию: 12.12.2022*
*Отправлена на доработку: 24.01.2023*
*Принята для печати: 14.03.2023*

ссылаясь на единое целое разных культур он разъясняя сущность «философии азербайджанства» особо отмечал о важности уединения.

Стратегическим планом и основными элементами «философии азербайджанства» являются - развитие азербайджанского языка, религии и культуры, а также сохранение национально-духовных ценностей и традиций. В статье все эти понятия разъяснены наглядными примерами. В целостности, «философия азербайджанства» Гейдара Алиева служит объединению, сохранению, развитию традиций независимости и созиданию правового - социального государства.

**Ключевые слова:** Гейдар Алиев, Азербайджанская республика, философия азербайджанства, азербайджанский язык, культура Азербайджана, национально-духовные ценности, национальное сознание, идеологическая безопасность

## Heydar Aliyev's philosophy of Azerbaijanism

**Aladdin Malikov***

**Abstract.** The sphere of manifestation of philosophy is thinking. Thinking itself appears and is reflected in different forms, which contributes to a different perception of philosophy. The study and teaching of philosophy as a science is its main direction, an important condition for which is the disclosure of truth. Throughout history, this process manifested itself first as a manifestation of philosophy in theology, and then as its reflection in poetry. "Philosophy of Azerbaijani Studies" by Heydar Aliyev is a discourse aimed at the formation and development of society. In other words, the national leader directed philosophy to its practical implementation in statehood and human life. According to our conclusions, Heydar Aliyev's "philosophy of Azerbaijani studies" was not only an intention, but also a means. The basis of this philosophy was laid in advance, but its full formation took place during the period of independence of Azerbaijan. The main tasks in this situation were self-consciousness, self-return and self-expression.

The basis of the essence of the “philosophy of Azerbaijani studies” is, regardless of the affiliation and dissent of the people, to preserve and

* Doctor of Philosophy in Philosophy, Associate Professor,
Leading Researcher of the Institute of Philosophy and Sociology of ANAS; Baku Azerbaijan
E-mail: aladdin.malikov@gmail.com
https://orcid.org/0000-0001-5830-6764

**To cite this article:** Malikov, A. [2023]. Heydar Aliyev's philosophy of Azerbaijanism. *“Metafizika” journal. 6(1),* pp.10-32.

**Article history:**
*Received: 12.12.2022*
*Accepted: 14.03.2023*

maintain the main traditions and cultural heritage. It is precisely such efforts that ensure the ideological security of society and actually prevent the creation of problems and barriers that block its development. Heydar Aliyev combined various understandings of globalization, multiculturalism and cosmopolitanism in a single understanding and reunited them in a common philosophy, which was called the “philosophy of Azerbaijani studies”. In his reports and speeches, explaining the essence of the "philosophy of Azerbaijani studies", he referred to a single whole of different cultures and noted the importance of solitude. The strategic plan and the main elements of the “philosophy of Azerbaijani studies” are the development of the Azerbaijani language, religion and culture, as well as the preservation of national and spiritual values and traditions. In the article, all these concepts are explained with illustrative examples. In integrity, Heydar Aliyev's "philosophy of Azerbaijani studies" serves to unite, preserve, develop the tradition of independence and create a legal-social state.

**Keywords*:*** Heydar Aliyev, Azerbaijan Republic, philosophy of Azerbaijanism, Azerbaijani language, Azerbaijani culture, national-moral values, national consciousness, ideological security

## REFERENCES

**1.** Malikov, A., & Amirov, E. (2020). Leader and boss: what's the difference? (Historical-political view). *Journal of Science and Life (ISSN:2710-0944), 4 (470).* pp. 25-31. http://dx.doi.org/10.13140/RG.2.2.22196.37763
**2.** Madatli, E. (2020). Heydar Aliyev’s philosophy of Azerbaijanism and independent state building. *“Political legacy of Heydar Aliyev and Azerbaijaniism” collection*. Baku, Science and Education publishing house.
**3.** Heydar Aliyev, *“The Road to Independence*”, Selected Thoughts. Baku, 1997. Responsible for release: Ramiz Mehdiyev. http://ebooks.preslib.az/pdfbooks/azbooks/independ.pdf 2
**4.** *Constitution of the Republic of Azerbaijan* (translator: Aladdin Malikov). Baku, Science and Education publishing house, 2019, 84 pages. p. 26, (http://dx.doi.org/10.33864/MTFZK.2019.32)
**5.** *Heydar Aliyev from his speech at the First Congress of World Azerbaijanis on November 9, 2001*. https://files.preslib.az/projects/diaspora/b1.pdf
**6.** Firidun Bey Kocherli, (1913). “Mother language”. *Molla Nasreddin magazine*, No. 22.

***7.*** Heydar Aliyev, June 9, 1972. *From the speech at the anniversary celebration of the 150th anniversary of the birth of Ashiq Alasgar at the Azerbaijan State Opera and Ballet Theater.*

**8.** Mehdiyev, R. (1996). The savior of our science and language. *"Azerbaijan" newspaper*, September 19.

**9.** Edited by: Guliyev, V. (1999). *The high debt and practice of literature: Speeches, reports, speeches.* Heydar Aliyev; Bib-ID. vtls000016460. Baku: Ozan. 496 p.

**10.** Habibbayli, I., & et al. (2018). *The image of Heydar Aliyev in literature from historical reality to ideal.* Baku, Science and Education publishing house. p.346

**11.** *On October 29, 1996, the speech of the President of the Republic of Azerbaijan Heydar Aliyev at the ceremonial opening of the mausoleum of the Azerbaijani poet and dramatist, outstanding writer Huseyn Javid in Nakhchivan.* (http://anl.az/el/emb/HuseynJavid/pdf/he_nitg-29.10.1996.pdf)

**12.** Nabiyev, B. (2007). *Studies about Heydar Aliyev*. Baku, Chinar-Chap publishing house.

**13.** *"Azerbaijan" newspaper*, April 11, 2000

**14.** *Excerpt from the speech of the President of the Republic of Azerbaijan Heydar Aliyev in 2002 at the Bibiheybet shrine.* (https://www.youtube.com/watch?v=TUyuaa20Mdo) and (https://www.islamtimes.org/az/article/118707/heyd%C9%99r-%C9%99liyev-islam-v% C9%99-a%C5%9Fura)

**15.** Transliteration and notes: Malikov, A. (2020). *Third-Gumbad Manuscript of "Kitabi-Dada Gorgud"*. Baku, Kaspi publications, 55 p., pp.19-20. (http://dx.doi.org/10.13140/RG.2.2.10067.30243)